# Azərbaycan Respublikasında insan kapitalının inkişafı təhsil strategiyasının əsas hədəfidir

**İlham Əhmədov**

**Müəllif:**
İlham Əhmədov — pedaqoji elmlər üzrə fəlsəfə doktoru, Azərbaycan Dövlət Pedaqoji Universitetinin «Hesablama riyaziyyatı və informatika» kafedrasının dosenti. E-mail: ziya-innov@mail.ru

**Annotasiya.** Bu gün Azərbaycan Respublikasının qarşısında duran strateji vəzifələrdən biri də sosial-iqtisadi həyatın modernləşdirilməsi, beynəlxalq təcrübə və elmi innovasiyaların uğurlu tətbiqidir. Qeyd olunan məsələlərin həlli, ilk növbədə, insan kapitalının inkişafını, insanların müasir bilik və bacarıqlara yiyələnməsini tələb edir. Bu səbəbdən son 15 ildə ölkəmizdə insan kapitalının inkişafına xüsusi diqqət yetirilir. Çünki müasir dövrdə dövlətlərin inkişaf səviyyəsi insan kapitalından daha çox asılıdır. Təsadüfi deyil ki, BMT-nin «Minilliyin İnkişaf Məqsədləri» proqramında davamlı inkişafın təmin edilməsi üçün müəyyən edilmiş 8 prioritet məqsədin əksəriyyəti insan kapitalının inkişafı ilə bağlıdır. İnsan kapitalının inkişafı Azərbaycan üçün də prioritet olub, ölkənin təhsil sisteminin ümdə vəzifəsidir. İnsan kapitalının inkişafı «Azərbaycan 2020: gələcəyə baxış» İnkişaf Konsepsiyası (2013-cü il), «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası», «Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi» (2016-ci il) kimi strateji sənədlərin prioritetidir. Bu konseptual sənədlərin məqsədi ölkədə insan kapitalının inkişafı ilə iqtisadiyyatın dayanıqlı inkişafını təmin etmək, əhalinin sosial rifahını yüksəltmək, bütün istiqamətlərdə tərəqqini sürətləndirmək, inkişafın keyfiyyətcə yeni modelini formalaşdırmaqdır.

**Açar sözlər:**
insan kapitalı, təhsil, təhsil strategiyası, təhsil standartı, informasiya cəmiyyəti.

**DOI:**
**Məqaləyə istinad:**
İlham Əhmədov. Azərbaycan Respublikasında insan kapitalının inkişafı təhsil strategiyasının əsas hədəfidir. *«Azərbaycan məktəbi» jurnalı.* № 2, 2018. səh.11–18

**Məqalə tarixçəsi**
Göndərilib: 20.05.2018; Qəbul edilib: 05.06.2018; Nəşr edilib:

# Development of human capital in the Azerbaijan Republic is the main objective of the educational strategy

**Ilham Ahmadov**

**Author:**
Ilham Ahmadov,
Candidate of Pedagogical Sciences, Associate Professor of the Azerbaijan State Pedagogical University.
E-mail:
ziya-innov@mail.ru

**Keywords:**
human capital, education, human capital, education strategy, education standard, information society.

**Abstract.** One of the strategic tasks facing the Republic of Azerbaijan is the modernization of social and economic life, application of scientific innovations and international experience in the country's economy. Solving these problems requires the development of human capital, the development of modern knowledge and competencies of the country's population. For this reason, the last 15 years have paid close attention to the development of human capital in our country. The level of development of the country is determined by the level of development of human capital. It is not by chance that in the Millennium Development Goals program the UN notes that for the sustainable development of the country it is necessary to develop human capital.
For these reasons, the development of human capital is paid close attention in the Republic of Azerbaijan. The development of human capital is the goal of the reform of the education system. In many strategic development programs of the country this is clearly defined.

**DOI:**
**To cite this article:**
Ilham Ahmadov. Development of human capital in the Azerbaijan Republic is the main objective of the educational strategy. *Azerbaijan Journal of Educational Studies.* No2, 2018. pp. 11–18

**Article history**
Received: 20.05.2018; Accepted: 05.06.2018; Published:

## Giriş

İnsan kapitalı — cəmiyyətdə özünü tam realizə etmək və cəmiyyətin imkanlarından maksimum istifadə etmək üçün insanın biliyinin, bacarığının, əlaqələrinin, peşəkarlığının cəmidir. Bu, intellekt, sağlamlıq, bilik, keyfiyyətli əmək və keyfiyyətli həyat şəraitidir. İnsan kapitalı — şəxsin gələcəkdə peşə fəaliyyəti zamanı gəlir gətirə biləcək istedad və qabiliyyətlərinə hazırda qoyulan sərmayədir.

Dünya İqtisadi Forumunun 2015-ci il üçün açıqladığı «İnsan Kapitalı İndeksi» hesabatında Azərbaycan 124 ölkə arasında orta sıralarda (63-cü) yer tutaraq Türkiyə, Çin, İndoneziya və Küveyt kimi ölkələri qabaqlamışdır. Dünya İqtisadi Forumunun 2016–2017-ci illər üçün açıqladığı Qlobal Rəqabətlilik Hesabatında isə Azərbaycan 138 ölkə arasında 35-ci olmuşdur.[1] Bu, Azərbaycanın formalaşmış insan kapitalına, həm də rəqabət qabiliyyətini yüksəltmək imkanlarına malik olduğunu göstərir.

Hazırda respublikamızın qarşısında duran strateji vəzifələrdən biri də sosial-iqtisadi həyatın modernləşdirilməsi, beynəlxalq təcrübə və elmi innovasiyaların uğurlu tətbiqidir. Qeyd olunan məsələlərin həlli, ilk növbədə, insan kapitalının inkişafını, insanların müasir bilik və bacarıqlara yiyələnməsini tələb edir. Bu səbəbdən son 25 ildə ölkəmizin əsas hədəfi insan kapitalının inkişafıdır. Çünki müasir dövrdə dövlətlərin inkişafı insan kapitalının səviyyəsi ilə müəyyən edilir. Təsadüfi deyil ki, BMT-nin «Minilliyin İnkişaf Məqsədləri» proqramında davamlı inkişafın təmin edilməsi üçün müəyyən edilmiş 8 prioritet məqsədin əksəriyyəti insan kapitalının inkişafı ilə bağlıdır.[2] Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bu mövzuda qeyd edir: «…Uşaqlarımız bilikli olmalı, dünyada gedən prosesləri izləməli, yeni texnologiyaya sahib çıxmalıdırlar. …İnsan kapitalı inkişaf etmiş ölkələrin indiki durumunu müəyyən edən amildir. Həmin ölkələr təbii resurslar hesabına yox, intellektual potensiala, yeni texnologiyaların icad olmasına, tətbiqinə görə inkişaf edirlər. Biz də bu yolu seçməliyik».

İnsan kapitalının inkişafı ölkə iqtisadiyyatının qlobal sistemə uğurlu inteqrasiyası şərti olub, ölkənin təhsil sisteminin əsas vəzifəsidir. İnsan kapitalının inkişafı «Azərbaycan 2020: gələcəyə baxış» İnkişaf Konsepsiyası (2013-cü il),[3] «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası»,[4] «Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi» (2016-ci il)[5] kimi strateji sənədlərin əsas prioritetidir. Bu konseptual sənədlərin məqsədi iqtisadiyyatın dayanıqlı inkişafını təmin etmək, əhalinin sosial rifahını yüksəltmək, bütün istiqamətlərdə tərəqqini sürətləndirmək, inkişafın keyfiyyətcə yeni modelini formalaşdırmaqdır. Müstəqillik illərində «qara qızılı insan kapitalına çevirək» devizi ilə təhsil sistemində bir sıra proqramlar icra edilmişdir: «Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təminatı Proqramı (2005-2007-ci illər)»,[6] «2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı»,[7] «2007-2015-ci illərdə Azərbaycan

[1] https://azertag.az/xeber/Azerbaycan_Qlobal_Reqabetlilik_Hesabatinda_35_ci_oldu-1097451.

[2] Minilliyin İnkişaf Məqsədləri Hesabatı, 2013. http://www.az.undp.org/content/azerbaijan/az/home/library/mdg/2013_MDG_Report.html..

[3] «Azərbaycan 2020: gələcəyə baxış» İnkişaf Konsepsiyası (2013-cü il). http://www.president.az/files/future_az.pdf .

[4] «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası», http://www.president.az/articles/9779.

[5] «Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi» . http://www.president.az/articles/21993, Əldə etmə tarixi: 27.03.2018

[6] «Azərbaycan Respublikası ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təmin proqramı» (2005-2007-ci illər). http://www.edu.gov.az/az/page/83/601.

[7] «2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı». http://www.edu.gov.az/az/page/83/599.

gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı»[8] və s.

### Təhsil üzrə milli strategiyanın perspektivləri

Təhsil insanlara texnologiyaları çevik mənimsəmək, əmək bazarında layiqli yer tutmaq və ömür boyu təhsil prosesinə qoşulmaq, sağlam həyat tərzi, ətraf mühitə münasibətdə düzgün mövqe seçmək kimi mühüm həyati keyfiyyətlər verir. Sosial-iqtisadi həyatın müasirləşdirilməsində təhsilin rolu təkcə təhsilalanın qazandığı bilik və bacarıqların iqtisadi amilə çevrilməsi ilə məhdudlaşmır. Təhsil prosesində əldə olunan bilik və bacarıqlar, həmçinin etik-əxlaqi norma və dəyərlər hər bir təhsilalanın cəmiyyətin layiqli üzvü olması üçün lazımi şərait yaradır, onu biliyi və etik davranışı sayəsində nümunəvi vətəndaşa çevirir.

Təhsil üzrə milli strategiyanın perspektiv məqsədi ölkədə səriştəli təhsilverənlərə, yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət nəticələri və əhatəliliyinə görə qabaqcıl dünya ölkələri sırasında önəmli mövqe tutan təhsil sistemini yaratmaqdır. Azərbaycanın təhsil sisteminin iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartlarına uyğun olması strategiyanın əsas hədəflərindəndir. Strategiyanın reallaşdırılması təhsilin məzmunu, kadr hazırlığı, təhsili idarəetmə sistemi və təhsil infrastrukturunun qabaqcıl beynəlxalq təcrübəyə və Azərbaycanın inkişaf konsepsiyasına uyğun yenidən qurulmasına imkan verərək, ölkədə biliklərə əsaslanan iqtisadiyyatın bərqərar olmasını, informasiya cəmiyyətinin təşəkkülünü və ölkənin davamlı inkişafını təmin edəcəkdir.

«Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası» səriştəli müəllim və təhsil menecerlərinə, qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sistemi yaradılması üçün 5 strateji istiqamətdə genişmiqyaslı tədbirləri nəzərdə tutur:

1. Səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılması.

2. Təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksək nüfuzlu təhsilverənin formalaşdırılması.

3. Təhsilin nəticələrə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət–ictimai xarakterli və dövlət–biznes partnyorluğuna əsaslanan idarəetmə sisteminin formalaşdırılması.

4. Müasir tələblərə cavab verən və ömür boyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması. Bu istiqamət təhsil müəssisələrində İKT əsaslı təlim metodologiyasına uyğun infrastrukturun yaradılması, təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılması, distant təhsil, yaşlıların təhsili, peşə-ixtisas və təhsil məsələləri üzrə məsləhət xidmətləri göstərən regional universal mərkəzlərin, müasir təminatlı peşə-tədris mərkəzlərinin və komplekslərinin qurulması kimi tədbirləri ehtiva edir.

5. Təhsilin dayanıqlı və müxtəlif mənbələrdən istifadə olunmaqla yeni maliyyələşdirmə mexanizminin yaradılması.

2015-ci ildə təsdiq edilmiş «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası»nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı[9] 2015-2025-ci illərdə strategiyanın icrasını əhatə edir. Hazırda strategiyanın icrasının birinci mərhələsi yekunlaşır. Hesab edirik ki, yaxın gələcəkdə fəaliyyət planının birinci mərhələsinin, gələcəkdə isə digər mərhələlərin də icrasının monitorinqinin aparılmasına ciddi ehtiyac var. Belə monito-

[8] «2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı» v. s. http://www.mfa.gov.az/files/file/16(2).pdf.

[9] «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası»nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı. http://www.edu.gov.az/upload/file/tehsilin_inkisafi_uzre_dovlet_strategiyasi_fealiyyet_plani.pdf.

rinqlər fəaliyyət planının növbəti mərhələsinin icrası və strategiyanın zəruri hallarda korreksiyası üçün zəruridir.

İnsan kapitalının ölkəmizdə inkişafı məqsədlərinə xidmət edən digər strateji sənəd Azərbaycan Respublikası Prezidentinin 6 dekabr 2016-cı il tarixli fərmanı ilə təsdiq edilmiş «Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi»dir.[10] Bu sənəddə qeyd edilir ki, insan kapitalının inkişafı təhsilin islahatlarından keçir. Buna nail olmaq üçün təhsilin bütün pillələrində keyfiyyətin yüksəldilməsi, təlimlər vasitəsilə işçilərin bilik və bacarıqlarının inkişaf etdirilməsində fasiləsizliyin təmin edilməsi, ixtisaslı kadr hazırlığının əmək bazarının tələblərinə uyğunlaşdırılması, şirkətlərin araşdırma və təkmilləşdirmə sahəsinə investisiya qoyuluşunun stimullaşdırılması, mövcud insan kapitalından səmərəli istifadə edilməsi tələb olunur. Bunu əsas tutaraq, Azərbaycanda iqtisadiyyatın transformasiyası istiqamətində həyata keçiriləcək islahatların ayrılmaz tərkib hissəsi kimi, insan kapitalının inkişafında fasiləsizliyin təmin edilməsi, əmək məhsuldarlığının yüksəldilməsi və biliyin iqtisadi inkişafda rolunun artırılması ilə bağlı tədbirlər hərtərəfli dəstəklənəcəkdir. Bu, iki səviyyədə təmin ediləcəkdir:

1) insan kapitalının formalaşması və inkişafı üçün təhsilin bütün pillələrində keyfiyyətin yüksəldilməsi;

2) əmək məhsuldarlığının yüksəldilməsini təmin etmək üçün insan kapitalının fasiləsiz inkişafının, araşdırma və təkmilləşdirmə sahəsinə investisiya qoyuluşunun stimullaşdırılması.

Bu strategiyada qeyd edilir ki, mövcud imkanlardan səmərəli istifadə etməklə, qısa və ortamüddətli perspektivdə insan kapitalını daha da inkişaf etdirmək və rəqabət qabiliyyətini artırmaq üçün insan potensialının inkişaf etdirilməsi, insan kapitalının keyfiyyətinin və əmək məhsuldarlığının yüksəldilməsi ilə bağlı məsələlərə xüsusi diqqət veriləcək, institusional və biznes mühiti daha da yaxşılaşdırılacaq, infrastruktur yaradılacaq, təhsil-təlim prosesi və ixtisaslı kadr hazırlığının, əmək bazarı və biznes sektoru arasında koordinasiyanın effektivliyi artırılacaq, innovasiyaya meyilli (elm və texnologiya tutumlu) istehsal (xidmət) sektorunun investisiya cəlbediciliyi artırılacaq, klaster yaratma təşəbbüsləri dəstəklənəcək və əmək məhsuldarlığının yüksəldilməsi üzrə əsas prioritetlər müəyyənləşdiriləcəkdir.

Strategiyada təhsilin inkişafı yolu ilə insan kapitalının inkişaf etdirilməsi üçün aşağıdakı prioritet istiqamətlər və görüləcək tədbirlər sadalanır:

**7.3.1. Prioritet 3.1. Təhsilin bütün pillələrində keyfiyyətin yüksəldilməsi.**

*Görüləcək tədbirlər:*

Tədbir 3.1.1: Məktəbəqədər təhsillə əhatəolunma səviyyəsinin yüksəldilməsi və təlim-tərbiyə texnologiyalarının təkmilləşdirilməsi.

Tədbir 3.1.2: Ümumi təhsilin keyfiyyətinin yüksəldilməsi və təmayülləşmənin inkişaf etdirilməsi.

Tədbir 3.1.3: İlk peşə və orta ixtisas təhsilinin əmək bazarının tələblərinə uyğunlaşdırılması.

Tədbir 3.1.4: Ali təhsil müəssisələrində «təhsil-tədqiqat-innovasiya» formatında inkişafın təşviqi.

Ali təhsil insan kapitalının formalaşmasında və inkişafında mühüm mərhələdir. Onun insan kapitalının formalaşmasına və inkişafına təsiri özünü iki şəkildə büruzə verir: 1) insan kapitalının formalaşmasında birbaşa iştirak edən ixtisaslı mütəxəssislərin hazırlanması; 2) yeni biliklərin yaranmasında, tətbiqində və ötürülməsində bilavasitə iştirak.

Tədbir 3.1.5: Elmi-tədqiqat fəaliyyətinin inkişafı və biliklərə əsaslanan cəmiyyət quruculuğunun dəstəklənməsi.

Tədbir 3.1.6: İnnovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin keyfiyyətinin

[10] «Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi». http://www.president.az/articles/21993.

yüksəldilməsi. Bütün təhsil pillələrində innovativ təlim metodologiyasının və müvafiq resursların yaradılması məqsədilə müsabiqə mexanizminin hazırlanması və müsabiqələrin keçirilməsi insan kapitalının inkişafı üçün vacibdir. Əlavə təhsil sahəsində keyfiyyətin yüksəldilməsi və rəqabət mühitinin formalaşdırılması üçün mülkiyyət formasından asılı olmayaraq, əlavə təhsil verən müəssisələrin potensialının gücləndirilməsi istiqamətində zəruri tədbirlərin həyata keçirilməsi dəstəklənəcəkdir.

Tədbir 3.1.7: İnsan kapitalının inkişafında iştirak edən fiziki və texnoloji infrastrukturun təkmilləşdirilməsi. Təhsil və elm sahəsində infrastrukturun təkmilləşdirilməsi bu sahələrin daha effektiv fəaliyyətinə təsir göstərə, insan kapitalının formalaşması və ondan istifadənin səmərəliliyini yüksəldə, innovasiyalara əsaslanan inkişafı təmin edə bilər.

Strategiyada qeyd edilir ki, İKT bilikləri insan kapitalının formalaşmasında və istifadəsində həlledici amillərdən biridir. Müasir məktəblərin və universitetlərin yaranması, araşdırma və təkmilləşdirmələrin aparılması, istehsal və xidmət müəssisələrinin fəaliyyəti bu və ya digər dərəcədə İKT texnologiyaları ilə bağlıdır. Hazırda ölkədə internetə çıxışı olmayan regionlar, məkanlar və məktəblər vardır. Yaxın və ortamüddətli perspektivdə ibtidai təhsildən başlayaraq, ümumi təhsilin bütün səviyyələrində İKT biliklərinin şagirdlərə aşılanması, qlobal informasiya məkanından səmərəli istifadə etmələri üçün maarifləndirmə tədbirlərinin həyata keçirilməsi dəstəklənəcəkdir. Orta məktəblərdə elektron kitabxanaların, intellektual oyunların yaradılması təşviq ediləcəkdir. İnternet resurslarından məqsədyönlü istifadə etmək üçün maarifləndirmə tədbirləri həyata keçiriləcəkdir. E-məktəb sisteminin tətbiqi, Təhsil İnformasiya Sisteminin hazırlanması ilə bağlı işlər dəstəklənəcəkdir. Təhsilin bütün səviyyələrindən məzun olan şəxslərin iqtisadiyyatın və cəmiyyətin inkişafı üçün zəruri rəqəmsal bacarıqları əldə etməsinə, eləcə də İKT-nin təklif etdiyi imkanlardan tədris və təlim prosesində bacarıqla istifadə olunmasına şərait yaradılacaqdır. Rəqəmsal tədrisin təşviqi məqsədilə, təhsilin bütün səviyyələrində kurikulumun yüksəkkeyfiyyətli rəqəmsal tədris materiallarının (məsələn, e-kitablar, e-seminarlar, açıq tədris materialları, veb-imtahanların keçirilməsi və s.) və müvafiq metodların köməyi ilə təkmilləşdirilməsi vacibdir.

**7.3.2. Prioritet 3.2. Əmək məhsuldarlığının yüksəldilməsini təmin etmək üçün insan kapitalının inkişafının stimullaşdırılması.**

Tədbir 3.2.3. İnnovasiya fəaliyyətinə investisiya qoyuluşunun təşviq edilməsi. İnnovasiya fəaliyyəti istehsal və idarəetmə sahələrində əmək məhsuldarlığının və rəqabətqabiliyyətliliyin yüksəldilməsi, insan kapitalının inkişafında fasiləsizliyin təmin edilməsi üçün əsas hərəkətverici qüvvədir. Azərbaycanda innovasiyanın təşviqini stimullaşdıracaq fəaliyyət planları və dövlət proqramları hazırlanarkən bu fəaliyyətin əhəmiyyəti nəzərə alınacaqdır. İnnovasiya fəaliyyətini stimullaşdırmaq üçün ölkə elmi araşdırma və təkmilləşdirmələrə yüksək texnologiyalı məhsulların istehsalına görə mükafatlar və kreditlər vermək yolu ilə geniş diapazonlu bilik şəbəkəsi yaratmaq sahəsində bir çox imkanlara malikdir. Bu müddəaların ardıcıl, mərhələli və davamlı şəkildə icrasının diqqət mərkəzində saxlanılması uyğun və optimal nəticələrin əldə olunması üçün vacibdir.

Azərbaycan Respublikası insan kapitalının inkişaf etdirilməsini təhsil siyasətinin əsas qayəsi hesab etməklə yanaşı, digər imkanlardan da faydalanmağa çalışır. Belə ki, ötən il «İnsan kapitalının inkişaf etdirilməsi, daha yaxşı gələcəyin qurulması» mövzusuna həsr olunmuş Ümumdünya Sərgisinin («Expo-2025») respublikamızda keçirilməsi ilə bağlı təklifi irəli sürməklə, növbəti vacib bir kampaniyaya imza atdı. Təklif olunan mövzunun əsas hədəfi «biz insanları – dünyada ən güclü resurs olan insan kapitalını universal müzakirəyə çıxaracağıq» devizidir. Bu məsələ ilə əlaqədar Azərbaycan Respublikasının Birinci vitse-

prezidenti Mehriban Əliyeva qeyd edir: «İnsan kapitalının inkişaf etdirilməsi, daha yaxşı gələcəyin qurulması» mövzusu, həqiqətən, hamını narahat edən bir məsələdir. Bu mövzu dövrümüzün əsas çağırışını – texnologiyanın və artan bağlılığın bəşəriyyətə təsirini əhatə edir. «Bakı Expo – 2025» sərgisində düşünürük ki, texnologiyadan daha uzağa baxmaq, diqqətimizi rəhbərlərdən sıravi vətəndaşlara yönəldərək iqtisadiyyatların, cəmiyyətlərin və yaradıcılığın aparıcı qüvvəsi olan insanlar üzərində cəmləşdirmək mühüm əhəmiyyət kəsb edəcək. Biz insanları – dünyada ən güclü resurs olan insan kapitalını universal müzakirəyə çıxaracağıq».[11]

Azərbaycanın insan inkişafı siyasəti vasitəsilə insan kapitalının formalaşması istiqamətində davamlı irəliləyişi onun «Expo 2025» üçün «İnsan kapitalının inkişaf etdirilməsi, daha yaxşı gələcəyin qurulması» mövzusunu tam uyğun edir. «Expo – 2025»in Bakıda keçirilməsi insan kapitalı siyasətinin atributuna çevrilə bilər. Bakı sərgisi müstəqillik dövründə Azərbaycanın əldə etdiyi nailiyyətlərin tanıdılması üçün daha bir imkan olacaqdır. Bu, həmçinin bütün gənc, müstəqil ölkələr üçün çox güclü bir stimuldur. 2025-ci ildə Ümumdünya Sərgisini təşkil etmək bizim səmimi istəyimizdir. Ümumdünya sərgisinin Bakıda keçirilməsi Azərbaycana böyük üstünlüklər gətirə bilər. Bu, ölkəmizin inkişafı üçün yeni yollar açacaq və iqtisadiyyatımızın bütün sahələrinə fayda gətirəcəkdir.

## Nəticə

Göründüyü kimi, Azərbaycan Respublikasında insan kapitalının inkişafı üzrə strateji sənədlərdə əsas prioritetlər kifayət qədər konkret və müasir tələblər nəzərə alınmaqla hazırlanmış, bu sahədə beynəlxalq təcrübədən istifadə edilmişdir. Növbəti mərhələdə müvafiq yol xəritələrinin və strategiyaların icra planı nəzərdə tutulduğu istiqamətdə və tempdə həyata keçirilməlidir. Bu işin səmərəli olması üçün zəruri səviyyədə maliyyələşməsi vacibdir. Çünki insan kapitalının formalaşması kimi ümummilli əhəmiyyət daşıyan sosial-iqtisadi məsələlər kifayət qədər maliyyə vəsaiti tələb edir. Strateji planların icrası üçün bu prosesin monitorinqi əsasdır. İnsan kapitalının inkişafı üzrə, məlum olduğu kimi, bir neçə Dövlət Proqramları və uzunmüddətli strateji yol xəritələri reallaşmalıdır. Bu proseslərin mərhələlər üzrə məqsədə nə dərəcədə yaxınlaşdığını müəyyən etmək və ehtiyac olduqca prosesləri korreksiya etmək zəruridir.

[11] https://azertag.az/xeber/Parisde_Bakinin_Expo_2025_Sergisine_namized_seher_olmasi_munasibetile_qebul_teskil_edilib_Azerbaycanin_Birinci_vitse_prezidenti_Mehriban_Aliyeva_tedbirde_istirak_edib__YENILANIB-1111831.

### İstifadə edilmiş ədəbiyyat

1. «Azərbaycan 2020: gələcəyə baxış» İnkişaf Konsepsiyası (2013-cü il). http://www.president.az/files/future_az.pdf.
2. «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası». http://www.president.az/articles/9779.
3. «Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi». http://www.president.az/articles/21993, Əldə etmə tarixi: 27.03.2018
4. «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası»nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı. http://www.edu.gov.az/upload/file/tehsilin_inkisafi_uzre_dovlet_strategiyasi_fealiyyet_plani.pdf.
5. Minilliyin İnkişaf Məqsədləri Hesabatı, 2013. http://www.az.undp.org/content/azerbaijan/az/home/library/mdg/2013_MDG_Report.html.
6. «Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təmin proqramı (2005-2007-ci illər)». http://www.edu.gov.az/az/page/83/601.

7. «2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı». http://www.edu.gov.az/az/page/83/599.
8. «2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı». http://www.mfa.gov.az/files/file/16(2).pdf.
9. https://azertag.az/xeber/Parisde_Bakinin_Expo_2025_Sergisine_namized_seher_olmasi_munasibetile_qebul_teskil_edilib_Azerbaycanin_Birinci_vitse_prezidenti_Mehriban_Aliyeva_tedbirde_istirak_edib__YENILANIB-1111831.
10. https://azertag.az/xeber/Azerbaycan_Qlobal_Reqabetlilik_Hesabatinda_35_ci_oldu-1097451.
11. Lennard N. (2018) *Kids These Days: Human Capital and the Making of Millennials.* Dissent Journal. Vol. 65. Issue 1, Foundation Study Independent Social Ideas Press, New York, USA, p. 132-134, DOI: 10.1353/dss.2018.0003.
12. Ozier, O. The Impact of Secondary Schooling in Kenya A Regression Discontinuity Analysis. Journal of Human Resources, Vol. 53, Issue 1., p.157-188, Univ. Wisconsin Press, DOI: 10.3368/jhr.53.1.0915-7407R.
13. Magnac, T., Pistolesi N., Roux S. *Post-Schooling Human Capital Investments and the Life Cycle of Earnings.* Journal of Political Economy. Vol. 126, Issue 3, pp.-1219 – 1249. DOI: 10.1086/697206, 2018, Univ. Chicago press, Chicago, USA.